**UOT: 619.576.33.576.851.48.615.779.9**

# QUŞLARIN QRİPİ VƏ ONA QARŞI MÜBARİZƏ TƏDBİRLƏRİ

**A.R.ƏSGƏROV, N.G.QULİYEV**
**AKTN Baytarlıq Elmi Tədqiqat İnstitutu**

*Quşların qripi yüksək kontagioz xəstəlikdir.Son zamanlar bütün dünya ölkələrində geniş yayılaraq quşçuluq təsərrüfatlarına ciddi ziyan vurur. İnfeksiyanın xaricdən ölkə təsərrüfatına daxil olmasının qarşısını almaq üçün dəqiq və ciddi tədbirlər tələb olunur. Xəstəliyin ləğvi də çox mürəkkəbdir. Məqalədə həmin tədbirlərdən bəhs edilir.*

***Açar sözlər:*** *müxtəlif növ tquşlar, qrip, diaqnostika, təfriqi diaqnostika, tədbirlər.*

Quşların qripi- iti, yüksək kontagioz xəstəlik olmaqla, ev quşları və vəhşi quşları yoluxdurur. Xəstəlik enzootiya və ya epizootiya şəklində baş verir, respirator orqanları və mədə bağırsaq traktını zədələməklə müxtəlif şişlərin əmələ gəlməsi, septisemiya ilə xarakterizə edilir və qrip virusunun seroloji tipi ilə törədilir. Xəstəlik bir çox ölkələrdə qeydə alınmışdır. Xəstəliyə bütün növ ev quşları yaşayış məntəqələrinin və quşçuluq təsərrüfatlarının ətrafında yaşayan sinantrop quşlar (göyərçinlər, sərçələr, qarğalar, qumrular, sığırçınlar), vəhşi quşlar (qağayılar, turaclar, torağaylar, tutuquşlar və s.) həssasdırlar. Xəstəlik fəsildən və coğrafi zonalardan asılı olmayaraq geniş yayıla bilər. Xəstəliyin yayılması xaotik xarakter alır, belə ki, bir quş damından tamamilə kənarda yerləşən başqa quş damında və ya qəfəsin birindən tam aralı başqa bir qəfəsdə baş verə bilər. Belə hallarda sağlam quşlar ya virusdaşıyıcı, ya da təkrar yoluxmada xəstələnmiş olurlar. Qrip virusunun 10 seroloji variantı vardır ki, müxtəlif növ quşlarda müxtəlif kliniki əlamətlərlə özünü göstərir. Ona görə də ayrı-ayrı quş növlərinin qriplə xəstəliyi klassik taun, keçici zökəm, infeksion sinusit, ördəklərin tənəffüs yollarının keçici zökəmi adlandırırdılar. Hazırda bütün bu xəstəliklərin törədicisi quşların qrip virusu adlanır.

Qrip baş verdikdə çoxlu ölümə, xəstə quşların çıxdaşına, məhsuldarlığın düşməsinə səbəb olduğundan təsərrüfat əhəmiyyətli dərəcədə iqtisadi ziyana düşür. Bütün hallarda xəstəlik baş verdikdə təsərrüfatda tam sanasiya aparılır.

Xəstəliyin mənbəyi xəstəlik keçirmiş, xəstə, inkubasiya dövründə olan sinantrop, vəhşi və ev quşları ola bilər. Çox hallarda xəstəliyin mənbəyi kliniki simptomu nəzərə çarpmayan, lakin qripə yoluxan quşlar ola bilər. İti keçən xəstəlikdən sonra virus bir ay ərzində ətraf mühitə yayılır.

Virusun ətrafa yayılması əsasən vəhşi quşların yumurta qoyma və balasalma dövründə baş verir. Törədici əsasən yuva, peyin, inventar, dövriyyədə olan taralar, ət,yumurta, lələk, tük, inkubatordan və kəsim sexinin tullantıları vasitəsilə yayılır. Xəstəliyin daşıyıcıları gəmiricilər, həşəratlar və s. ola bilər. Quş qripinin virusu ev və vəhşi heyvanlardan da ayrılmışdır. Su hövzələrində köçəri quşlarla təmasda olan ördəklər yüksək virulentli quş qripi ştamının mənbəyi ola bilər.

Xəstəlik təsərrüfatlarda virusun mütləq iştirakı ilə fövqəladə hallarda baş verir. Sexlərdə temperaturun kəskin düşməsi, qalxması, zəhərli qazların, nəmliyin normadan çox olması, duzdan, minerallardan, yemdən zəhərlənmələr, sıxlıq və yaş həddinin pozulması halları buna səbəb ola bilər. Xəstəlik habelə quşlarda ağciyərin iti keçən mikozlardan və xroniki keçən infeksiyalardan, terapevtik koliseptisemiya, alimentar distrofiyadan sonra da baş verə bilər. Belə hallarda xəstəlik əvvəlcə xəstə və zəif, sonra da sağlam quşlar arasında yayılır. Xəstəliyin 2-5-ci günündə ölüm halları kəskin surətdə artaraq 7-14 günə ən yüksək nöqtəsinə çatır və 20-25-ci günə xəstəliyin kliniki əlamətləri yox olur. Xəstəliyin başlanmasına Nyukasl xəstəliyinin təsərüffatda xroniki getməsi ilə də əlaqədar ola bilər, sonradan qarışıq infeksiya şəklində yayılır. Quşların qrip törədicisi ortomiksovirus ailəsinə daxildir və ya seroloji tipinə aiddir. Virusun əsas komponenti S-antigen (RNT və polipeptid) A cinsi KBR vasitəsilə təyin edilir. Antigen dəyişikliyi quş qripi virusu üçün ən xarakterik əlamətdir və onu başqa viruslardan fərqləndirir. Virusun yeni seroloji antigen dəyişikliyi epizootiya və enzootiyanın inkişafında əsas rol oynayır. Quş qripinin seroloji variantları bir-biri ilə müxtəlif növ quşların və onların yaş qruplarına görə virulentlikləri ilə fərqlənirlər. Onlardan bir neçəsinə yalnız toyuqlar, bəzilərinə ördəklər, digər tiplərinə isə hind toyuqları həssasdırlar. Lakin bu həssaslıq şərti xarater daşıyır. Belə ki, eyni tip virusun müxtəlif növ quşları yoluxdurması hallarına az təsadüf olunmamışdır.

Bəzi hallarda isə epizootiya dövründə yaş qrupuna və cinsi əlamətlərinə görə müxtəlif həssaslıq nəzərə çarpır. Quşların yoluxması əsasən aerogen, kontakt və alimentar yollarla, həmçinin transvarial yol ilə də baş verə bilər.

Son zamanlar yoluxmanın latent yollarla baş verməsi təsdiq olunmuşdur. Yoluxma müddəti 80 gün davam edir.

Xəstəliyin kliniki əlamətləri müxtəlifdir. Toyuqlar arasında qrip baş verdikdə onlarda süstlük, yemdən imtina etmə, yumurtlama azalır, suya hərislik, çətin nəfəs alma, dənciyin atoniyası, burun və dimdikdən selik axıntısı, hərəkətin koordinasıyanın pozulması, parez və qıcolma, pipiklərin və saqqalların göyərməsi və şişkinlik, sonra isə diareya əlaməti müşahidə olunur. Kloaka ətrafı adətən bulaşıq olur. Peyin duru qaz qabarcıqları ilə, bəzən də qan qarışığı ilə müşayiət olunur. Sinusit və sinovit halları baş və boyun nahiyyəsinin şişməsi ilə baş verir. Bu əlamətlərin bəziləri ayrılıqda, yaxud bir neçəsi birlikdə müşahidə oluna bilər.

Hind toyuqlarında qripin gedişi toyuqlarda olduğu kimi müşayiət olunur. Hər iki növ quşlarda güclü toksikoz qeyd olunur ki, bunun nəticəsində çox hallarda kliniki əlamətlər nəzərə çarpmadan ölüm baş verir. Xəstə quşlarda həftə ərzində yumurtanın məhsuldarlığı 65-2,4% aşağı düşür. Sağaldıqdan sonra məhsuldarlıq artsa da,əvvəlki səviyyəyə qalxmır.

Ördəklər arasında qrip respirator orqanlarının iltihabı, sinusitlə, rinitlə və pnevmoniya ilə müşayiət olunur. Toyuqlarda olduğu kimi mədə-bağırsaq sistemini də zədələyir.

Patoloqoanatomik dəyişikliklər bütün növ quşlarda demək olar ki, oxşardır. Pipikləri və saqqalları tünd göy, az hallarda qara rəngdə çiçəyəbənzər dəyişikliklər, əzələlər göyərmiş, bəzi hallarda nöqtəvari qan sağıntıları nəzərə çarpır. Nazik və yoğun bağırsaqların selik qişalarının kataral hemoroji iltihabı nöqtəvari və ya zolaqlı qan sağıntısı nəzərə çarpır. Bu əlamətlər bəzən vəzili yaxud əzələli mədə ilə vəzili mədənin keçid hissəsində də aşkar olunur. Dalaq və qaraciyər həcmcə böyüyür və durğunluq əlaməti yaranır. Adətən quşların qripində qastroenterit, peritonit, perikardit, bronxit, aerosakkulit, ağciyərin şişkinliyi, daxili orqanlarda durğunluq halları müşahidə edilir. Xəstəlik iti keçən zaman tələf olan quşlarda arıqlama nəzərə çarpır.

Quş qripinin diaqnostikası epizootiki, kliniki və patoloqoanatomiki göstəricilərini nəzərə almaqla laboratoriya müayinəsi əsasında aparılır. Quş qripi kliniki və patoloqoanatomiki göstəricilərinə görə nəzərə almaqla başqa xəstəliklərə oxşadığından laboratoriya müayinəsi əsas göstəricidir. İnfeksiyanı nyukasl xəstəliyindən, infeksion loringotraxeitdən, çiçəkdən, mikoplazmozdan, bakteriya və parazitlərin törətdikləri bəzi xəstəliklərdən, eləcə də zəhərlənmələrdən differensasiya etmək lazımdır.

Hazırda bütün ölkələrdə quş qripinə qarşı qabaqlayıcı tədbirlər aktual məsələdir.Odur ki, bizim ölkədə də həmin xəstəliyin vaxtında aşkarlanması və ciddi qabaqlayıcı tədbirlərin görülməsi üçün mütəmadi monitorinqlər təşkil edilir. Hər bir şübhəli hallar hər tərəfli yoxlanaraq dərindən təhlil edilir.

Diaqnoz təsdiq edilərsə, karantin qoyulur. Xəstə, zəif və yoluxmayan şübhəli quşlar məhv edilir. Təsərrüfat üzrə xüsusi komissiya yaradılır və həmin komissiya Azərbaycan Respublikasının "Baytarlıq haqqında" Qanununa əsasən bütün tədbirləri öz nəzarətinə götürərək xəstəliyin ləğvi, eyni zamanda insanların yoluxmasının qarşısını almaq istiqamətində əlaqədar Nazirlik və təşkilatlarla birgə tədbirlər planı hazırlayıb maddə-maddə həyata keçirməlidir.

**ƏDƏBİYYAT**

**1.**Ветеринарная энциклопедия Т-2. Москва 1969. **2.** Лабораторные исследования в ветеринарии. Москва. Колос 1971. **3.** Справочник ветеринарного врача птицеводческого предприятия. Москва. Колос 1982 **. 4.**Материалы международной юбилейной научно-практической конференции. Санкт-Петербург Ломоносов 2004. **5.** Грошева Г.А., Тихонов З.В. Справочник по инфекционным болезные птиц специализированных промышленных предприятий, мелкотоварных ферм и приусадебных хозяйств. Москва 2007. **6.** "Quşların qripi və ona qarşı mübarizə tədbirləri", Bakı ETBİ. 2006. **7.**E.Əliyev, İ.Həsənov "Quşların qripi və onunla mübarizə tədbirləri". Bakı 2006. **8.** Əliyev E.A., Əzimov İ.M., Vəliyev U.M., Şəfi N.V. "Epizootologiya və infeksion xəstəliklər". Bakı 2013.

**Грипп птиц и меры борьбы**

**А.Р.Аскеров, Н.Г.Гулиев**

Грипп птиц является острой контагиозной инфекцией вирусного происхождения. Широко распространено во всех странах мира наносит огромный ущерб хозяйствам. Для предотвращения и ликвидации инфекции требуется больших усилий.

В статье перечислены основные методы борьбы с инфекцией.

***Ключевые слова:*** *различные виды птиц, грипп, диагностика, дифференциальная диагностика, мероприятии.*

**Bird flu and control measures**

**A.R. Askerov, N.G.Guliyev**

Avian influenza is an acute contagious infection of viral origin. Widespread in all countries of the world causes enormous damage to farms. Great effort is required to prevent and eliminate infection.

The article lists the main methods of fighting infection.

***Key words:*** *various types of birds, influenza, diagnosis, differential diagnosis, event.*